AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
M.FÜZULİ adına ƏLYAZMALAR İNSTİTUTU

# FİLOLOGİYA MƏSƏLƏLƏRİ

## № 9

*Toplu Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyası tərəfindən rəsmi qeydiyyata alınmışdır (Filologiya elmləri bölməsi, №13).*
*Azərbaycan Respublikası Ədliyyə Nazirliyi Mətbu nəşrlərin reyestrinə daxil edilmişdir. Reyestr №3222.*

«Elm və Təhsil»
Bakı – 2010

## ƏDƏBİYYATŞÜNASLIQ

**TEYYUB ARIX OĞLU QULİYEV**
*AMEA Nəsimi adına Dilçilik İnstitutu*
*Bakı ş. H.Cavid prospekti 31, V mərtəbə*
*teyyubq@mail.ru*
*altaist@hotmail.com*
*filologiya elmləri namizədi*

# MÜASİR DİLÇİLİKDƏ MONOGENEZ MƏSƏLƏSİ

Dillərin monogenezi məsələsi nəzəri dilçilikdə yeni problem olmasa da, bunula bağlı hələ konkret nəticə əldə edilməmişdir. Bu, ən müxtəlif səbəblərlə izah olunsa da, fikrimizcə, ilk səbəb bəzi dil ailələrindəki (o cümlədən Altay, Ural-Altay, hind-Ural dil ailələri) dillərin həm daxili, həm də bir-biri ilə uzaq qohumluğu ideyasının dilçilikdə hələ də fərziyyə olaraq qəbul edilməsidir.

Məlumdur ki, dillərin monogenezi məsələsinin nəzəri əsasını nostratika (*Noster* (latınca "bizim" deməkdir) – terminini ilk dəfə 1903-cü ildə danimarkalı dilçi H.Pedersen işlətmişdir) nəzəriyyəsi təşkil edir. Nostratik nəzəriyyə 6 dil ailəsinin (hind-Avropa (balto-slavyan, german, hind-İran, kelt, yunan və s.), afrsiya (sami, Misir, kuşit, xad və s.), kartvel (gürcü, svan və s.), dravid (tamil, teluqu və s.), fin-uqor (Pribaltika-fin, obsk-uqor, samodi və s.) və Altay (türk, monqol, tunqus-mancur, Koreya, yapon)) qohumluğu ideyasını irəli sürür.

Nostratika nəzəriyyəsi H.Pedersenin adı ilə bağlı olsa da (yeri gəlmişkən, qeyd edək ki, H.Pedersen bu sahəyə ayrıca tədqiqat həsr etməmiş dillərin uzaq qohumluğu haqqındakı fikirlərini 1903-cü ildə çap etdirdiyi ***"Türkische Lautgesetze"*** adlı məqaləsində vermişdir (1, s.1)), ümumilikdə bu istiqamət bir neçə mərhələnin son nəticəsi kimi qəbul olunmalıldır. Nostratikanı fundamental bir məktəbə çevirən görkəmli rus dilçisi V.M.İlliç-Svitıç həmin mərhələləri aşağıdakı kimi ümumiləşdirmişdir:

"...1. Hind-Avropa-Ural (yalnız hind-Avropa-fin-uqor) dil ailələrinin oxşarlığı. Bu məsələyə İ.Kino, N.Anderson, V.Tomsen və xüsusilə F.Koppen əsərlər həsr etmişdir.

2. Ural-Altay nəzəriyyəsi. V.Şottun, M.Kastrenin, O.Donnerin, Q.Vinklerin əsərləri bu nəzəriyyənin yaranmasında və inkişafında əsas rol oynamışdır.

3. Hind-Avropa və sami-hami dillərinin oxşarlığı. Q.Müller, A. Kyuni, M.Koen və s. bu məsələni əsərlərində geniş işıqlandırmışlar.

4. Altay-dravid dillərinin müqayisəli öyrənilməsi. Bu məsələ ilə bağlı H.Hulberqin (Koreya-dravid dil əlaqələri), P.Meylenin, K. Boudanın (dravid-tunqus-mancur əlaqələri) əsərlərini misal göstərmək olar. Bundan başqa, Altay dillərinin hind-Avropa dilləri ilə əlaqəsi də bəzi dilçilərin (H.Qüntert, St.Mladenov, Q.Koppelman və s.) tədqiqat obyekti olmuşdur (1, s.43-44).

Məhz H.Pedersenin tədqiqatı ilə (bu barədə qeyd etdik) dil ailələrinin makroailədə birləşdirilməsi və tədqiqi məsələsi müqayisəli dilçilikdə yeni istiqamət oldu. Təxminən əlli ildən sonra (bu illər ərzində dillərin monoqenezi ilə bağlı tədqiqat əsərləri çox azdır) V.M.İlliç-Svitıçın pronostratik dilin bərpası (xüsusilə leksik səviyyədə) ilə bağlı tədqiqatları işıq üzü gördü (2;3;4;1;5;6) və bununla da Moskva müqayisəli dilçilik məktəbi dünya dilçiliyində nostratikanın mərkəzinə çevrildi. Həmin məktəbin görkəmli nümayəndələri (V.İvanov, V.Dıbo, A.Dolqopolski*, S.Starostin, Y. Helimski) bu gün də dünya dillərinin monogenezi məsələsi üzrə dünyanın ən aparıcı mütəxəssisləri hesab olunurlar.

Təbii ki, dünya dillərinin monogenezi məsələsi müasir nəzəri və müqayisəli dilçilikdə birmənalı qəbul olunmur. Bəzi dilçilər (məsələn, hətta Altay dillərinin qohumluğunu qəbul edə bilməyən A.Şerbak (8)) dillərin nostratik qohumluğunu ən yaxşı halda qeyri-mümkün hesab edirlər. Onların fikrincə, dillər arasındakı qarşılıqlı əlaqə zamanı hər iki dildə təzahür edən alınmaları araşdırmaq, onların mənşəyini tapmaq çox çətindir və bu baxımdan nostratik dilçiliyin əldə etdiyi nəticələrə pozitiv yanaşmaq olmaz. Lakin unutmaq olmaz ki, alınmalar lüğətdə müəyyən semantik sfera (məsələn, mədəni sfera) və müəyyən qrammatik kateqoriyalarla (məsələn, fellər qədimliyi və milliliyi ilə isimlərdən çox fərqlənirlər) sərhədlənirlər. Digər tərəfdən, müqayisənin miqyasını genişləndirmək və digər dilləri müqayisəyə cəlb etməklə alınma sözləri milli sözlərdən ayırmaq mümkündür.

Nostratik nəzəriyyənin opponentləri israrla qeyd edirlər ki, nostratik dilçilik ilk növbədə «dillərin ənənəvi müqayisəsindən sonrakı müqayisə lazımdırmı?» sualına cavab verməlidir. Bizim qənaətimizə görə, bu cür müqayisənin vacibliyini şərtləndirən səbəblər var. Çünki, fikrimizcə, ənənəvi təsnifatı (genealoji təsnifat nəzərdə tutulur) qənaətbəxş hesab etmək olmaz. Məqalədə bunu əsaslandırmağa çalışacağıq.

---

* Moskva dilçilik məktəbinin görkəmlb nümayəndəsi olan A.Dolqopolski 1976-cı ildən İsrail dövlətində yaşayır və Hayf Universitetinin ivrit dili kafedrasının professorudur. 2008-ci ildə fundamental «Nostratik lüğət» əsərini çap etdirmişdir (bax: 7).

Əvvəla, dünya dillərinin vahid təsnifata ehtiyacı var. Bir-birindən heç nə ilə asılı olmayan dil ailələrindən bəhs edən təsnifatı uğurlu hesab etmək çox çətindir. Əgər təsnifat varsa, təsnif olunanlar arasında əlaqə olmalıdır. Çünki digər elmlərdə olduğu kimi (məsələn, genetikada canlı aləmin taksonomiyası), təsnifat hissələrə bölmək və hissələr arasındakı münasibətləri (və ya əlaqələri) müəyyənləşdirməkdən ibarət olmalıdır. Dillərin ənənəvi təsnifatı isə ailələr arasındakı genealoji əlaqəni ən yaxşı halda nəzərə almamışdır. Eyni zamanda, mövcud genealoji təsnifatlar (ayrı-ayrı mübahisəli məqamları nəzərə almasaq, bütün genealoji təsnifatlar, demək olar ki, üst-üstə düşür) dillərin diferensiallaşmasından sonrakı mənzərəsini təsvir edir. Yəni hər bir dil ailəsinin (tutaq ki, hind-Avropa dil ailəsinin) müəyyən bir protodildən (protohind-Avropa dilindən) bölündüyü qeyd olunsa da, həmin protodilin özünün necə yarandığı və áyrıca bir dil kimi hansı bütövdən ayrılaraq müstəqilləşdiyi (nəzəri dilçilikdə qeyd olunduğu kimi, hətta dialekt səviyyəsində belə) göstərilmir. Başqa sözlə, ən qədim protodil haqqında heç bir təsəvvür olmadan sonrakı protodillərin bölgüsü aparılır. Buna görə də dünyanın dil ailələrinin sərhəddi müəyyənləşəndən sonra belə bir sual meydana çıxır: bu dil ailələri arasında genetik əlaqə varmı? Hər bir dil ailəsinə daxil olan dillərin qohumluğunu sübut edən metodlarla dil ailələrinin özlərini müqayisə etmək olmazmı? Tutaq ki, qədim yunan, qədim hind, qədim german və s. dillərini müqayisə etməklə protohind-Avropa dilini, qədim türk, qədim monqol dillərini müqayisə etməklə protoaltay dilini bərpa etdiyimiz kimi protohind-Avropa və protoaltay dillərini müqayisə edib ulu əcdad dili bərpa etmək olmazmı? Ümumiyyətlə, əgər bir dil ailəsi daxilində dillərin müqayisəsi vacib hesab edilirsə, ümumiyyətlə dil ailələrinin (heç olmasa, ən böyük dil ailələrinin) müqaiysəsi niyə vacib və əhəmiyyətli sayılmasın?

Müasir elmlərin bir-birinə inteqrasiyası, daha doğrusu, elmlərin qovuşuğunda yaranan yeni elm sahələri, oxşar metodologiyalar və ortaq metodlardan istifadə, xüsusilə arxeologiya və genetikanın əldə etdiyi faktlarla (bu ayrıca məqalə mövzusu olduğundan həmin məsələ üzərində geniş dayanmaq istəmirik) dil faktlarının müqayisəsi və ümumiləşdirilməsi monogenezin xeyrinə qənaətbəxş nəticələr verir. Deməli, b.e.ə. IV-V minilliyə aid olduğu təxmin edilən dil informasiyası bütövlükdə bəşəriyyətin tarixi ilə məşğul olan bütün elmlər üçün fövqəladə əhəmiyyət kəsb edir. Məhz buna görə də dillərin diferensasiyasından sonrakı mərhələni diqqət mərkəzinə çəkən ənənəvi müqayisədən sonrakı müqayisə vacibdir. Məlumdur ki, bu cür müqayisə öncə tipologiyaya əsaslanacaq. Yeri gəlmişkən deyək ki, tipologiya

genealoji təsnifata yenidən baxılmasına qəti maneə ola bilməz. Belə bir fikir hökm sürür ki, dil ailələrinin sonrakı müqayisəsini məhz müxtəlif tipoloji quruluşlara (aqqlütinativ, flektiv və s.) malik olmaları qeyri-mümkün edir. Amma artıq məlumdur ki, dünya içərisində içərisində saf, təmiz dil tipi tapmaq çox çətindir. İstənilən dil tipində digərinin özəlliyini görmək olar ki, bunu da məhz monogenezlə izah etmək mümkündür. Əminik ki, diaxron planda dərinliyə etdikcə bu müxtəliflik daha da azalacaq. Tipologiyaların müqayisəsi ən əvvəl iki nəticənin əldə olunması ilə sonunclana bilər: 1) dillərin qohumluq münasibətlərini ortaya qoymaq; 2) dillərin təkamülünü, dəyişikliklərin xronologiyasını izləmək. Bunların hər ikisi dilçilik üçün olduqca önəmli nəticələrdir.

Bəzən tənqidçilər qeyd edirlər ki, iki qohum dil 5-6 min il ərzində əsas uyğunluqları itirə bilər. Belə olan halda onların qohumluğundan hətta bəhs etmək mümkünsüzdür. Ancaq unutmaq olmaz ki, monogenez məsələsində söhbət dillərin müasir vəziyyətindəki müqayisəsindən deyil, dil ailələrinin bərpa olunmuş protodillərinin müqayisəsindən gedir və mümkündür ki, həmin dillər müasir dillərə nisbətən bir-birilərinə daha yaxın olsunlar.

Mülahizələri müşahidə edərkən aydın görünür ki, monogenez məsələsinin fundamental elmi tədqiqat obyekti kimi qəbul etdirməyin bir yolu da müqayisənin metodologiyasının düzgün seçilməsidir. Başqa sözlə, dillərin monogenezinin problem kimi həllində ilk növbədə dəqiq metodoloji istiqamətin və faktlara yanaşmanın seçilməsi əsas zərurətlərdən biridir və bu xüsusi diqqət tələb edir. Amerikalı dilçi Allan Bomhard göstərir ki, dillərin monogenetik qohumluğu məsələsində iki əsas yanaşma mövcuddur: birinci yanaşmanı «ilkin taksonomiya» adlandırmaq olar. Bu yanaşmanın mahiyyəti ondan ibarətdir ki, ilk növbədə dilləri dil ailələri yaxud makroailə tərkibində qruplaşdırıb təsnif etmək gərəkdir. Dilçi qeyd edir ki, birinci yanaşma hind-Avropa müqayisəli dilçiliyinin Rasmus Rask, Frans Bopp, Yakob Qrimm dövrünü xatırladır. Çünki bu yanaşmada qrammatik formaların müqayisəsi əsas yer tutur. İkinci yanaşma «ilkin bərpa»dır (9, c.17). Həqiqətən də, fikrimizcə, «təxminən 10 min il bizdən geridə qalan (biz bu rəqəmi yuvarlaq götürürük. Ümumiyyətlə, əcdad dilin yaşı məsələsi haqqında müxtəlif fikirlər var. Məsələn, V.A.Dıbonun və İ.İ.Peyrosun fikrincə, ən qədim diferensasiya afrasiya dillərində baş verə bilər. Digər ailələrin bölünməsi bir neçə min il əvvəl, yeni dil ailələri isə 3-4 min əvvəl bölünüb (10, s.56)) dili (bütün dil ailələri üçün vahid oln əcdad dil nəzərdə tutulur) bərpa etmək olarmı?» sualına pozitiv cavab vermək olar. Belə ki, məlum olduğu kimi, ənənəvi müqayisəli-tarixi təhlil müəyyən

tarixi təkamülün nəticəsi olan dillərin (bir ailə daxilində) müqayisəsini nəzərdə tutur və sonda onların protodilini bərpa etməyə yönəlir. Bu cür müqayisə və bərpaetmədən sonra məntiqi olaraq növbəti mərhələyə - protodillərin müqayisəsinə və daha qədim ulu dilin bərpasına keçmək olar. Bu da dillərin monogenetik baxımdan öyrənilməsinin əsas istiqamətlərindən biri ola bilər.

Dillərin vahid qohumluğunun öyrənilməsinə çətinlik törədən başqa bir səbəb də (bu səbəb də kifayət qədər önməlidir) dil ailələrinin müxtəlif səviyyələrdə öyrənilməsidir. Hələ keçən əsrin 70-ci illərində görkəmli dilçi V.A.Dıbo nostratik nəzəriyyənin qəbul olunmamasının üç əsas səbəbini göstərirdi: «...1. Bir sıra tədqiqatçılar Altay dil ailəsinin mövcudluğunu sübut olunmuş hesab etmirlər...2. Kartvel dillərinin tədqiqatçıları bu dil ailəsini İber-Qafqaz dil ailəsinin bir hissəsi hesab edirlər. Lakin İber-Qafqaz ulu dili bərpa olunmadığından təbii ki, İber-Qafqaz qohumluğu da sübut olunmur...3. Qeyd etmək lazımdır ki, göstərilən beş dil ailəsi qapalı çoxluq deyil. Qəti mümkündür ki, çukot-kamçatka, eskimo-aleut, nivx, yukagir dilləri də nostratik makroailəyə aid olsun.» (11, s.400-401). Tanınmış rus komparativisti S.Starostinin qeydini də yada salsaq, vəziyyəti bir qədər də aydın şəkildə təsəvvür edərik. S.Starostin «Dil qohumluğunun sübutu» adlı məqaləsində yazır: «... Nostratik tipli makroailənin daxilindəki qohumluğu qiymətləndirmək üçün əksər mütəxəssislərin ayrı-ayrı dil ailələri haqqında sadəcə bilikləri çatmır...» (12, c.781).

Doğrudan da, məlum olduğu kimi, yarandığı vaxtdan bu günə qədər müqayisəli dilçilikdə hind-Avropa dil öyrənilməsi aparıcı yer tutur və əldə olunan elmi nəticələrin çoxu hind-Avropa dillərinə aiddir. Digər dil ailələri (xüsusilə Altay, İber-Qafqaz və s.) üçün bunu söyləmək çox çətindir. Hətta komparativistikanın hələ ki son böyük uğurlarından olan S.Starostinin «Altay problemi və yapon dilinin yaranması» adlı monoqrafiyasından (10) sonra da Altay dil ailəsinin mövcudluğu birmənalı qəbul olunmur. Əksinə altayşünaslığın tam elmi əsaslara söykəndiyi bu monoqrafiyada inandırıcı şəkildə sübut olunsa da, Q.Dörfer, S.Klouson və A.Şerbak kimi alimlər sona qədər bu nəzəriyyəyə opponent olaraq qaldılar (bu barədə biz «Altay dillərinin qohumluğu məsələsi» adlı monoqrafiyamızda geniş bəhs etmişik. Bax: (14, s.52-66)). Buna görə dillərin monogenezi ideyasının tərəfdarları digər dil ailələrinin öyrənilməsini ən azından hind-Avropa dil ailələrinin öyrənilmə səviyyəsinə çatdırılmasını əsas vəzifələrdən biri hesab edirlər. Ümumiyyətlə, onlar bu sahədə tədqiqatları iki mərhələdə aparmağı təklif edirlər: 1) mövcud dil ailələri haqqında mövcud elmi nəticələri

ümumiləşdirmək (xüsusilə Altay, Ural-Altay və s.), onların genetik münasibətlərini müəyyənləşdirmək və protodilləri bərpa etmək; 2) bərpa olunmuş protodillərin qarşılıqlı münasibətini araşdırmaq və ilkin ulu dilin bərpasına cəhd göstərmək. Yeri gəlmişkən, nostratiklər öz nəzəriyyələrini əsaslanırmaq üçün artıq bir neçə uğurlu addımlar atmışlar. Məsələn, mərhum rus dilçisi S.Starostin, amerikalı M.Rulen, C.Benqtson, çex dilçisi V.Blajek və b. inandırıcı dəlillərlə Çin-Qafqaz (Sino-Qafqaz) dil ailəsinin mövcudluğu ideyasını irəli sürmüşlər (15,16,17). Bu faktda diqqəti çəkən əsas cəhət odur ki, həm Çin, həm də Qafqaz xalqları etnosların tarixi miqrasiyasında o qədər də fəal iştirak etməmişlər və onların qarşılıqlı əlaqəsinin səviyyəsi digər etnoslarla müqayisədə sıfıra bərabərdir. Məhz bu səbəbdən adları çəkilən tədqiqatçıların üzə çıxardığı həm leksik, həm də qrammatik uyğunluqlar yalnız və yalnız nostratik dilçiliyin xeyrinə qiymətləndirilə bilər.

Yuxarıda qeyd olunanları ümumiləşdirərək belə nəticəyə gəlmək olar ki:

1. **Dillərin monogenezi məsələsi, opponentlərinin israrından fərqli olaraq, müasir nəzəri dilçilikdə kifayət qədər aktual bir problemdir və müqayisəli dilçiliyin ən yeni istiqamətlərindən biri hesab olunmalıdır. Əldə olunan nəticələr bu fikri daha da qətiləşdirir. Lakin bunlara baxmayaraq bu sahədə fundamental tədqiqatlara ehtiyac duyulur.**
2. **Monogenez məsələsinin həllində müqayisəli metod əsas metod hesab olunur.**
3. **Dil ailələrinin protodillərini müqayisə etməklə ulu əcdad dili bərpa etmək mümkündür və monogenez məsələsinin uğurlu həll olunmasında dönüş nöqtəsi olacaq.**

**Резюме**

Статья посвящена проблеме моногенезиса языков. В статье анализированы некоторые вопросы, существующие в теоретическом языкознании. По мнению автора, с помощью сопосталения протоязыков разных языковых семей, возможно реставрировать общий протоязык

**Summary**

The article has been dedicated to the monogenezis of languages. In the article has been analized some problems conserning in the theoretical linguistics. Acording yo the auther's mind, buy the way of the

contrasting the protolanguages of the different language families, it is possible to reconstruct the general protolanguage.

## Istifadə olunmuş ədəbiyyat


1. Иллич-Свитыч В.М. Опыт сравнения ностратических языков. Введение. Сравнительный словарь (в.-К.).М., «Наука», 1971, 369 стр.
2. Иллич-Свитыч В.М. Генезис индоевропейских рядов гуттуральных п свете данных внешнего сравнения. «Проблемы сравнительной грамматики индоевропейских языков.» Тезисы докладов. М. 1964, стр.22-26.
3. Иллич-Свитыч В.М. Соответствия смычных в ностратических языках. "Этимология. 1966.». М., 1968, стр. 304-355.
4. Иллич-Свитыч В.М.. Материалы к сравнительному словарю ко-стратических языков (индоевропейский, алтайский, уральский, дравидский, картвельский, семитохамитокий). «Эгимология. 1965». М., 1967, стр. 321-374.
5. Иллич-Свитыч В.М. Опыт сравнения ностратических языков. Сравнительный словарь (l.-z.).М., «Наука», 1976, 155 стр.
6. Иллич-Свитыч В.М. Опыт сравнения ностратических языков. Сравнительный словарь (p.-q.).М., «Наука», 1994, 135.
7. Dolgopolsky A. Nostratic Dictionary. McDonald Institute for Archaeological Research University of Cambridge. 2008. 3116
8. Щербак А. О ностратических исследованиях с позиций тюрколога.– Вопрсы языкознания, 1984, № 6, стр. 30-42.
9. Bomhard A.R. Nostratic, Eurasiatic, and Indo-European. Nostratic: Sifting the Evidence. Ed. J.Salmons, B.Joseph. Amsterdam-Philapelphia, 1998. Pp. 17-50.
10. Дыбо В.А., Пейрос И.И. Проблемы изучения отдаленного родства языков. Вестник Российский Академии Наук. М., 1985, №2, стр. 55-66
11. *Дыбо В.А.* Ностратическая гипотеза: (Итоги и проблемы). Изв. Академии наук СССР. Серия литературы и языка, том 37, № 5, 1978, С. 400-413.
12. Старостин С.А. О доказательстве языкового родства. Typology and Theory of Language (a Festschrift for A. Ye.

Kibrik on his 60th Birthday). Moscow: Languages of Russian Culture, 1999, pp. 57-69.

13. Старостин С.А. Алтайская проблема и происхождение японского языка. М., «Наука», 1991, 190 стр.
14. Quliyev T. Altay dillərinin qohumluğu məsələsi. Bakı, «Nurlan», 2006, 145 s.
15. Blajek B., Jonh D. Bengtson. Lexica Dene-Caucasica. Central Asiatic Journal. Wiesbaden. 1995, pp. 11-50 .
16. Ruhlen M. Dene-Caucasian: A new linguistic family. To appear In K. Omoto (ed.). The Origins and Past of Modern Humans—Towards Rec-oncikatton. Singapore. World Scientific. 1997, Pp.1-15.
17. Starostin S. Word-final Resonants in Sino-Caucasian.//Journal of Chinese Linguistics, vol. 24.2, 1996. Berkeley, 1996. Pp. 281-311.

**Açar sözlər:**

**Azərbaycan dilində:** monogenez, nostratika, müqayisəli metod, dil ailələri, protodil

**Rus dilində:** моногенез, ностратика, сравнительный метод, языковые семьи, протоязык

**İngilis dilində:** monogenez, nostratica, comparative method, language families, protolanguage

*Çapa təqdim edən:* **İlham Tahirov Filologiya elmləri doktoru**

*Çapa tövsiyə edən:* **AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun 30 sentyabr 2010-cu il tarixinin 6 saylı protokolundan çıxarış**

*Məqalənin redaksiyaya daxil olma tarixi:* 29.VII.2010

*Təkrar işlənməyə göndərilmə tarixi:* 22.VIII.2010

*Çapa göndərilmə tarixi:* 30. VIII.2010